"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"
H.Əliyev



Heydər Əliyev 100

## 31 Dekabr – Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il bayramı münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərovun TƏBRİKİ



**Hörmətli həmkarlar, əziz tələbələr, dəyərli məzunlar!**

Azərbaycan Dövlət Pedaqoji Universitetinin çoxminli professor-müəllim və tələbə heyətini, məzunlarını, bütün əməkdaşlarını 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il bayramı münasibətilə səmimi-qəlbdən təbrik edir, elmi-pedaqoji fəaliyyətinizdə, təhsil və şəxsi həyatınızda yeni nailiyyətlər arzulayıram.

Başa vurduğumuz 2023-cü il ölkəmiz, xalqımız və universitetimiz üçün olduqca əlamətdar bir dövr kimi yadda qaldı. Azərbaycan Müzəffər Ali Baş Komandanı, Prezident İlham Əliyevin rəhbərliyi altında tarixi Zəfərini daha da möhkəmləndirərək, qısamüddətli lokal antiterror tədbirləri ilə öz dövlət suverenliyini tam bərqərar etdi, Qarabağa Böyük Qayıdışın yeni mərhələsi çərçivəsində bölgəyə əhalinin mütəmadi olaraq köçürülməsi prosesinə başlanıldı. Artıq yeni dövrün Qarabağ məktəblərində zəfərin fidanları biliyin sirlərinə yiyələnirlər. Cənab İlham Əliyevin ilk dəfə Prezident vəzifəsinə seçilməsinin 20-ci ildönümündə Xankəndidə üçrəngli Azərbaycan bayrağını qaldıraraq xalqa müraciət etməsi və şəhərin mərkəzi meydanında keçirilmiş möhtəşəm Zəfər paradı qüdrətli dövlətin və güclü liderin qətiyyətinin təntənəsi oldu.

İlin sonu ölkəmizin həyatında bir sıra digər mühüm siyasi və beynəlxalq hadisələrlə tarixin yaddaşına köçdü. Azərbaycan Prezidenti İlham Əliyevin düşünülmüş siyasətinin daha bir bəhrəsinin şahidi olduq. Belə ki, Azərbaycan Respublikası Prezidentinin Administrasiyası və Ermənistan Respublikası Baş nazirinin Aparatının birgə bəyanatı iki ölkə arasında davamlı sülhün bərqərar olmasına ümidləri artırdı. Eyni zamanda 2024-cü ildə BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası - COP29-un Azərbaycanda keçirilməsi haqqında yekdil qərar Prezident İlham Əliyevin siyasi müdrikliyinin, Azərbaycanın qüdrətinin və ona olan etimadın bir daha təsdiqidir. Ümumilikdə, ölkəmiz və xalqımız qarşıdan gələn 2024-cü ilə həm də növbədənkənar prezident seçkisi ilə səciyyələnən inkişaf epoxasının yeni mərhələsi kimi daxil olur. Bu isə bizdən yüksək vətəndaş məsuliyyəti, ziyalı mövqeyi və milli həmrəylik tələb edir.

**Əziz həmkarlar, tələbələr və məzunlar!**

Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi ilə əlamətdar olan 2023-cü ildə bütün ölkədə olduğu kimi, Pedaqoji Universitetdə də silsilə tədbirlər, simpozium, konfrans və sərgilər təşkil olundu, böyük şəxsiyyətin irsinin dərindən öyrənilməsi və təbliği istiqamətində çeşidli layihələr həyata keçirildi.

İlboyu Pedaqoji Universitetin tədris və elmi-pedaqoji həyatında da mühüm nailiyyətlərə imza atıldı. Belə ki, ilin əvvəllərində ADPU növbəti 5 il üçün uğurla institusional akkreditasiya olundu və artıq ixtisaslar üzrə proqram akkreditasiyası prosesinə başlanılıb. Cari ildə Universitetdə bakalavriat və magistratura səviyyələrində yeni ixtisaslar açıldı, qəbul yerləri artırıldı, nəzərdə tutulan plan demək olar ki, tamamilə doldu. Digər tərəfdən rəsmi proqramlarla yanaşı, Universitetdə qeyri-formal təhsil proqramlarının tətbiqinə start verildi, ADPU-nun Strateji İnkişaf Mərkəzinin Elm və Təhsil Nazirliyinin dəstəyi ilə icra etdiyi "Məktəb Liderliyi Proqramı"nın I çağırışı yekunlaşdı və hazırda II çağırış üzrə dərslər davam etdirilir.

İl ərzində Pedaqoji Universitet beynəlxalq və ikitərəfli əlaqələrində də əhəmiyyətli irəliləyişlərə nail oldu. Universitetimiz ölkənin tanınmış elm-təhsil ocaqları ilə yanaşı, Türkiyə, Avropa, MDB və Mərkəzi Asiyanın ali təhsil ocaqları ilə əməkdaşlıq imkanlarını genişləndirdir.

Bununla bərabər, növbəti ildə təhsil ictimaiyyətinin qarşısında başqa mühüm vəzifələr durur. Xankəndi şəhərində 1969-cu ildə Qarabağda ilk ali məktəb olaraq bizə doğma hazırkı Azərbaycan Dövlət Pedaqoji Universitetinin filialı kimi fəaliyyətə başlamış və sonradan müstəqil instituta çevrilmiş ali təhsil müəssisəsinin bazasında Prezident İlham Əliyevin Sərəncamı ilə Qarabağ Universitetinin təsis edilməsi, habelə ölkə müəllimlərinin ali məclisinin - Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş Azərbaycan Müəllimlərinin XVI Qurultayının keçirilməsi kimi tarixi hadisələr yeni inkişaf üfüqləri açır və hamımızın üzərinə əlavə məsuliyyət qoyur. Hər birimiz ümumdövlət əhəmiyyətli bu işlərdə əlimizdən gələni əsirgəməməli, müəllimlər ordusu olaraq "Azərbaycan 2030" hədəflərinə doğru inamla irəliləməliyik.

Bir daha sizi əlamətdar bayramlar münasibətilə ürəkdən təbrik edir, yeni təqvim ilində möhkəm cansağlığı, tələbələrimizə qarşıdan gələn qış imtahan sessiyasında uğurlar arzulayıram.

**Bayramlarınız mübarək!**






## Kibertəhlükəsizlik trendləri və kibertəhlükəsizlik təhsili mövzusunda maarifləndirmə tədbiri



Noyabrın 28-də Pedaqoji Universitet və Azərbaycan Kibertəhlükəsizlik Təşkilatları Assosiasiyasının (AKTA) birgə təşkilatçılığı ilə kibertəhlükəsizlik sahəsində trendlər və kibertəhlükəsizlik təhsilinin ümumi təhsil müəssisələrinə inteqrasiyasının əhəmiyyətinə dair maarifləndirici tədbir keçirilib. Tədbiri giriş nitqi ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov AKTA İdarə Heyətinin sədri Elvin Balacanovun rəhbərlik etdiyi nümayəndə heyətini və tədbir iştirakçılarını salamlayaraq Universitet haqqında ətraflı məlumat verib və 4-cü sənaye inqilabı dövründə kibertəhlükəsizliyin xüsusi önəmini vurğulayıb.

Daha sonra təqdimatla çıxış edən AKTA İdarə Heyətinin sədri Elvin Balacanov ölkəmizdə kibertəhlükəsizlik ekosisteminin gücləndirilməsi məqsədilə hüquqi, təşkilati və texniki sferalarda həyata keçirilən tədbirlər, həmçinin AKTA tərəfindən təhsil müəssisələri ilə əməkdaşlığın genişləndirilməsi məqsədilə atılmış addımlar və icra edilmiş layihələr barədə tədbir iştirakçılarını məlumatlandırıb. Həmçinin təhsil müəssisələrində kibertəhlükəsizlik üzrə təhsilə önəm verilməsinin, xüsusilə də, ADPU-nun müvafiq fakültə məzunları tərəfindən gələcəkdə ümumi təhsil müəssisələrində təhsil alan şagirdlərə kibertəhlükəsizlik sahəsində də ilkin biliklər aşılanmasının əhəmiyyəti vurğulanıb.

Daha sonra AKTA İdarə Heyətinin sədr müavini Rauf Cabbarov çıxış edərək Assosiasiyanın dəstəyi ilə hazırda bir neçə ali təhsil müəssisəsində yaradılmaqda olan kiber-klubların önəmi barədə məlumat verib.

## ADPU-da Beynəlxalq Əlillər Günü qeyd olundu




Dekabrın 1-də Məktəbəqədər təhsil fakültəsinin təşkilatçılığı ilə Beynəlxalq Əlillər Gününə həsr edilmiş "Rəngli dünyam" adlı tədbiri keçirilib. Tədbirdə ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Məktəbəqədər təhsil fakültəsinin dekanı, dosent Nailə Hüseynova, kafedra müdirləri professor Ramiz Əliyev, professor Müseyib İlyasov, professor Şəhla Əliyeva, Simnarə Heydərova, Daun sindromlu şəxslərin Reabilitasiya Mərkəzinin nümayəndəsi Könül Süleymanova, Respublika Gözdən Əlillər Cəmiyyətinin sədri Səmyar Abdullayev, Azərbaycan Karlar Cəmiyyətinin prezidenti Bəhram Hüseynov, Quba Psixologiya və Nitq İnkişaf Mərkəzinin direktoru Fidan Bağırova, o cümlədən ixtisas kafedraları üzrə TEC sədrləri və fakültənin professor-müəllim heyəti iştirak edib.

Tədbir Ulu Öndər Heydər Əliyevin və şəhidlərin xatirəsini bir dəqiqəlik sükut ilə yad edilməsi ilə başlayıb. ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, prof. F.Rzayev açılış nitqi ilə çıxış edərək Azərbaycanda sağlamlıq imkanları məhdud şəxslərin cəmiyyətə inteqrasiyası, sosial həyatı və təhsili üçün genişmiqyaslı Dövlət Proqramı icra olunduğunu, məktəblərdə inklüziya yanaşmasının tətbiq edildiyini, eyni zamanda ADPU-nun Məktəbəqədər təhsil fakültəsində müvafiq ixtisaslar üzrə yüksəksəviyyəli mütəxəssislərin hazırlandığını, Universitetdə İnklüziv təhsil Mərkəzinin fəaliyyət göstərdiyini diqqətə çatdırıb. Tədbirin gedişində sağlamlıq imkanları məhdud Ayşə Qasımovanın "Zər qanadlı kəpənək" kitabının təqdimatı keçirilib, daun sindromlu uşaqların rəqsi, gözdən əlil uşaqlar üçün 38 saylı musiqi məktəbinin "Duyğu" xalq çalğı alətləri ansamblının ifaları tədbiri daha da rəngarəng edib.

## Pedaqoji Universitetin Filologiya fakültəsinə yeni dekan seçilib

Dekabr ayının 1-də Universitetin Filologiya fakültəsinin ümumi yığıncağı keçirilib. Yığıncağın gündəliyində Filologiya fakültəsinə yeni dekan seçilməsi məsələsi qoyulub.

ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanovun sədrliyi, Elmi katibliyin əməkdaşı Səfa Əhmədovanın katibliyi ilə keçirilən yığıncaqda Filologiya fakültəsinin dekanı v.i.e., ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova, İnsan resursları şöbəsinin müdiri Qumral Qədimova, dekanlığa namizədlər və fakültənin professor-müəllim heyəti iştirak edib.

Yığıncağı açıq elan edən sədr dos. E.Aslanov bildirib ki, fakültənin dekanı vəzifəsi üzrə mətbuatda elan dərc olunandan sonra 3 nəfər namizədliyini irəli sürmüş, daha sonra 1 nəfər namizədliyini geri götürmüşdür. Prorektor qeyd edib ki, dekanlığa namizədlər - Filologiya fakültəsinin elmi işlər üzrə dekan müavini, f.ü.f.d. Həsənova Könül Nəriman qızı və Pəniyeva Günel Saleh qızı ötən dövr ərzində fakültənin kafedralarında görüşlər keçirmiş, platformalarını təqdim edərək, müzakirələrdə iştirak etmişlər.

Daha sonra dekanlığa namizədlər öz platformaları haqqında qısa məlumat veriblər.

Platformaların təqdimatından sonra səsvermə prosesinə başlanılıb. Əvvəlcə, kafedra nümayəndələrindən seçilmiş 6 nəfərdən ibarət Say komissiyası yaradılıb və əməkdaşlar seçki bülletenlərində öz seçimlərini qeyd ediblər. Sonda Say komissiyasının sədri, dosent Nazilə Abdullazadə səsvermənin nəticələrini elan edərək bildirib ki, fakültənin 186 nəfər əməkdaşından 182 nəfərinin iştirak etdiyi seçkilərdə 180 nəfər Könül Həsənovaya, 2 nəfər isə Günel Pəniyevaya səs veriblər.



Beləliklə, f.ü.f.d. Könül Həsənova Pedaqoji Universitetin Filologiya fakültəsinin yeni dekanı seçilib.

Çıxış edən f.ü.f.d. K.Həsənova ona göstərdikləri böyük etimada görə fakültənin professor-müəllim heyətinə təşəkkürünü bildirərək qeyd edib ki, platformasında da qeyd etdiyi kimi Filologiya fakültəsində ötən dövrlərdə əldə olunan nailiyyətlərin davamlılığını təmin etmək, beynəlxalq və ikitərəfli elmi əlaqələri, elmi tədqiqatları inkişaf etdirmək istiqamətində yorulmadan fəaliyyət göstərəcək, fakültənin Azərbaycan filoloji təhsilinin mərkəzinə çevrilməsi yolunda əlindən gələni əsirgəməyəcək.

Sonda təəssüratlarını bölüşən ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, prof. M.Hüseynova yeni seçilən dekana fəaliyyətində uğurlar arzu edib, onun rəhbərliyi ilə fakültənin daha da böyük uğurlar əldə edəcəyinə əminliyini ifadə edib.

## Şəhid məzun Tural Dəmirçiyevin ailəsi ziyarət olunub

Dekabrın 2-də ADPU Yeni Klubun nəzdində fəaliyyət göstərən Vətənpərvərlik klubunun təşkilatçılığı ilə tələbələr Pedaqoji Universitetin məzunu, Vətən müharibəsi şəhidi Tural Dəmirçiyevin ailəsini ziyarət ediblər.

Şəhidin ailə üzvləri tələbələrə Turalın keçdiyi şərəfli döyüş yolu və xatirələrindən danışıb, onun vətənə olan sevgi-məhəbbətinin tükənməzliyini vurğulayıblar. Şəhidin ADPU-nun II tədris ilinin tələbəsi Aytac İbrahimova tərəfindən çəkilmiş rəsmi ailəsinə hədiyyə olunub. Qeyd edək ki, 2020-ci ilin sentyabrın 21-də hərbi toplanış çərçivəsində Azərbaycan Quru Qoşunlarının əsgəri kimi təlimlərə qatılan Tural Dəmirçiyev 2020-ci ilin sentyabrın 27-də başlanan Vətən müharibəsində Füzulinin azad edilməsi uğrunda gedən ağır döyüşlərdə iştirak edib. Dəmirçiyev oktyabrın 5-də Füzuli istiqamətindəki döyüşlərdə qəlpə yarasından şəhid olub. Ölümündən sonra "Vətən uğrunda" medalı ilə təltif edilib.



## "Silahlı münaqişə ocaqlarında həyat fəaliyyətinin təhlükəsizliyi problemi" mövzusunda elmi konfrans



Dekabrın 7-də Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyinin (FHN) Bakı Regional Mərkəzi, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) və Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Gənclər Təşkilatının (ADPU TGT) birgə təşkilatçılığı ilə "Silahlı münaqişə ocaqlarında həyat fəaliyyətinin təhlükəsizliyi problemi" mövzusunda elmi konfrans keçirilib.

Pedaqoji Universitetdə həyata keçirilən konfransda açılış nitqi ilə çıxış edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev universitetdə belə vacib məsələlər ilə bağlı maarifləndirici konfransın keçirilməsinin əhəmiyyətini vurğulayıb.

ATGTİ-nin sədri Pərviz Mirələmli təhsil müəssisələrində fövqəladə hallar zamanı icra olunmalı tədbirlərlə bağlı maarifləndirmənin vacibliyini qeyd edib.

Rəsmi hissədən sonra fövqəladə hallarla bağlı tələbələrin məruzələri dinlənilib. Məruzələrdən sonra Fövqəladə Hallar Nazirliyinin fəaliyyət istiqamətlərinə həsr olunmuş videoçarx nümayiş olunub.

Yekun çıxışı edən FHN-in Bakı Regional Mərkəzinin rəisi, general-mayor Məhərrəm Həsənov məruzə edən gənclərin hazırlıq səviyyəsinin qürur doğurduğunu qeyd edərək belə əhəmiyyətli məsələlərin diqqətə çatdırılmasında göstərdikləri fəallığa görə təbrik edib. Sonda konfrans iştirakçıları sertifikatla təltif edilib.

## ADPU-nun prorektoru "TÜRKSOY-un 30 illiyi" yubiley medalı ilə təltif olunub




ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov Beynəlxalq Türk Mədəniyyəti Təşkilatının (TÜRKSOY) "TÜRKSOY-un 30 illiyi" yubiley medalı ilə təltif edilib. Medalı TÜRKSOY-un baş katibi, pofessor Sultan Rayev təqdim edib.

Qeyd edilməlidir ki, türk dünyası universitetlərində ilk TÜRKSOY kafedralarından biri 7 dekabr 2017-ci il tarixində ADPU-da yaradılıb. Yaradıldığı vaxtdan həmin kafedraya professor Asəf Zamanov rəhbərlik edir. Kafedranın fəaliyyəti dövründə türk dünyasının görkəmli elm, mədəniyyət və siyasi xadimlərinin yubileyləri münasibətilə beynəlxalq elmi konfranslar, konqreslər təşkil edilmiş, həmçinin A.E.Krımskinin "Nizami və müasirləri" monoqrafiyası ilk dəfə Azərbaycan dilinə tərcümə edilmişdir.

# Elmi Şuranın iclası: Pedaqoji Universitet Qarabağ Universitetinin fəaliyyətinə hərtərəfli dəstək verəcək



Dekabrın 8-də ADPU-nun Elmi Şurasının iclası keçirilib. İclasa sədrlik edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov açılış nitqində ötən müddət ərzində ölkədə və ADPU-da baş verən yeniliklərdən söz açaraq bu dövrdə universitetin yerli və beynəlxalq əlaqələrinin genişləndiyini, eyni zamanda ali təhsil ocağında Zəfər tariximiz, Qərbi Azərbaycana qayıdış və şəhidlərin xatirəsinin anılması ilə bağlı silsilə tədbirlər təşkil olunub.

Məruzə edən ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov növbəti semestrdən Pedaqoji Universitetdə pedaqoji internaturanın tətbiq olunmağa başlanacağını diqqətə çatdırıb. Prorektor xüsusi vurğulayıb ki, hazırda qarşıdakı mühüm işlərdən biri də Ölkə Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə təsis olunan Qarabağ Universitetinin fəaliyyətinə dəstəklə bağlı təkliflər paketinin hazırlanaraq Elm və Təhsil Nazirliyinə təqdim olunmasıdır. Dos. E.Aslanov, eyni zamanda, Qarabağ Universitetinin fəaliyyətinə dəstəklə bağlı ADPU-da işçi qrupun yaradılacağını diqqətə çatdırıb. Qeyd olunub ki, 1969-cu ildə Xankəndidə ADPU-nun filialı kimi fəaliyyətə başlayan Xankəndi Dövlət Pedaqoji İnstitutunun bazasında yaradılan Qarabağ Universiteti həm də mənəvi varislik baxımından Pedaqoji Universitet kollektivi üçün xüsusi önəmə malikdir.

Çıxış edən ADPU-CVU ikili diplom proqramının ADPU üzrə proqram direktoru Tofiq Əhmədov isə Təhsildə Keyfiyyət Təminatı Agentliyi tərəfindən həyata keçirilən ikili diplom proqramlarının proqram akkreditasiyası ilə bağlı özünütəhlil hesabatı haqqında məlumat verib. Hesabatın təsdiq olunaraq Agentliyə təqdim olunması haqqında qərar qəbul olunub. Bildirilib ki, növbəti ilin əvvəlindən digər ixtisaslar üzrə də vahid proqram akkreditasiyası prosesinə start veriləcək. Cari məsələlərin müzakirəsində tədris işləri üzrə prorektor, dos. Eldar Aslanov 2024-cü ildə keçiriləcək proqram akkreditasiyası ilə bağlı "ibtidai sinif müəllimliyi" ixtisası üzrə İbtidai təhsil fakültəsində müvafiq komissiyanın yaradılması, elm və innovasiyalar üzrə prorektor, prof. Asəf Zamanov professor və dosent elmi adlarının verilməsi ilə bağlı Ali Attestasiya Komissiyası qarşısında vəsatət qaldırılması, rektorun müşaviri Ümid Mehdiyev bir müddət öncə Azərbaycan Respublikasının Maliyyə Nazirliyinin Dövlət Maliyyə Nəzarəti Xidməti tərəfindən universitetdə həyata keçirilən maliyyə nəzarəti tədbirlərinin yekunları və şəhid ailəsi üzvü olan bir qrup tələbənin təhsil haqqından azad edilmələri haqqında məruzə ediblər. Yekunda müvafiq qərarlar qəbul olunub.

# Pedaqoji Universitetdə Mədəniyyət və İncəsənət Universitetinin 100 illiyi qeyd olundu

Dekabrın 11-də ADPU-da Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) 100 illik yubileyinə həsr olunmuş təntənəli tədbir keçirilib. Tədbirdə hər iki ali təhsil ocağının rəhbərliyi, əməkdaşları, ADPU-nun professor-müəllim və tələbə heyəti iştirak ediblər. Əvvəlcə, Universitetin foyesində Ulu Öndər Heydər Əliyevin abidəsi və "Zəfər guşəsi" ziyarət olunub, sonra qonaqlar Pedaqoji Universitetin İncəsənət və fiziki tərbiyə fakültəsinin müəllim və tələbələrinin əl işlərindən ibarət rəsm sərgisi ilə tanış olub, ADPU-nun Heydər Əliyev Muzeyini ziyarət ediblər.

Əfruz Süleymanovanın drijorluğu ilə ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsinin tələbə xorunun ifasında Azərbaycan Respublikasının Dövlət Himni ifa olunub, şəhidlərin və Ulu Öndərin xatirələri bir dəqiqəlik sükutla yad edilib.

Açılış nitqi ilə çıxış edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti Azərbaycanın zəngin ənənələrə və tarixə malik ali təhsil müəssisələrindən biri, elm və mədəniyyət ocağı olaraq təhsilimizin və mədəniyyətimizin inkişafında özünəməxsus rol oynayır. Azərbaycanın görkəmli mədəniyyət və incəsənət xadimlərinin arasında çoxlu sayda ADMİU məzunu var. Rektor vurğulayıb ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Universitetin 100 illik yubileyinin keçirilməsi ilə bağlı Sərəncamı ADMİU-nun fəaliyyətinə ən ali diqqətin təzahürüdür. Pedaqoji Universitetlə Mədəniyyət və İncəsənət Universiteti arasında məhsuldar əməkdaşlıq əlaqələrinin günü-gündən daha da inkişaf etdiyini diqqətə çatdırıb. Çıxış edən ADMİU-nun rektoru, professor Ceyran Mahmudova göstərilən diqqətə və ali təhsil ocağının yubileyi ilə bağlı təşkil olunan yüksəksəviyyəli tədbirə görə ADPU ailəsinə minnətdarlığını bildirib. Daha sonra rektor, prof. C.Cəfərov prof. C.Mahmudovaya Pedaqoji Universitet adından xatirə hədiyyəsi və təbrik adressatı təqdim edib. ADMİU-nun 100 illik fəaliyyəti haqqında videoçarxın nümayişindən sonra ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsinin müəllim və tələbələrinin ifasında geniş konsert proqramı təqdim olunub.







# ADPU aliminin monoqrafiyası Almaniyada altı dildə çap olunub

Pedaqoji Universitetin Tarix və coğrafiya fakültəsinin Ümumi pedaqogika kafedrasının dosenti, fəlsəfə elmləri doktoru Müslüm Nəzərovun "Philosophical problems of science and education in postindustrial society" ("Postsənaye cəmiyyətində elm və təhsilin fəlsəfi problemləri") adlı monoqrafiyası (sayca 4-cü monoqrafiyası) Almaniyanın "LAP LAMBERT" Akademik Nəşriyyatı (2023-cü il, 448 s.) tərəfindən ingilis, alman, italyan, portuqal, fransız və rus dillərində nəşr olunub.



Müəllimlər və tədqiqatçılar üçün nəzərdə tutulan monoqrafiyada sosial-fəlsəfi və pedaqoji proses kimi təhsilin mahiyyəti və formalarından, müasir təhsil modellərindən, onun formalarından, təhsilin sosial əsaslarından və sosial inkişafının xüsusiyyətlərindən, postsənaye cəmiyyətində təhsil mədəniyyətinin formalaşmasından, təhsilin müasir fəlsəfi problemləri, cəmiyyətin və təhsilin inkişaf amillərindən bəhs edilir.

Xatırladaq ki, buna qədər də müəllifin bir neçə monoqrafiyası və əsərləri Azərbaycanda və xarici ölkələrdə nəşr olunub.

# Ümummilli Lider Heydər Əliyevin anım gününə həsr olunmuş tədbir



Dekabrın 11-də ADPU-nun Heydər Əliyev Mərkəzinin təşkilatçılığı ilə Ulu Öndər Heydər Əliyevin anım gününə həsr olunmuş konfrans keçirilib. Tədbirdə Universitet rəhbərliyi, fakültə dekanları, şöbə, mərkəz və kafedra müdirləri, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Konfrans Ulu Öndərin və ölkəmizin suverenliyi, ərazi bütövlüyü uğrunda şəhid olmuş Vətən övladlarının xatirəsininin yad edilməsi ilə öz işinə başlayıb. Daha sonra İncəsənət və fiziki tərbiyə fakültəsinin xorunun ifasında "Ulu Öndər" mahnısı səslənib.

Giriş nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, başa çatmaqda olan 2023-cü ilin ən mühüm hadisələrindən biri Ümummilli Lider Heydər Əliyevin 100 illiyinin qeyd edilməsi oldu. İl ərzində Pedaqoji Universitetdə əlamətdar yubileyə həsr olunmuş müxtəlif məzmunlu tədbirlər – konfranslar, dəyirmi masalar, seminarlar, sərgilər və s. keçirildi, ayrı-ayrı fakültələrin 1000-dək tələbəsini əhatə edən "Heydər Əliyev dərsləri" təşkil olundu.

Ümummilli Liderə həsr olunmuş sənədli filmin nümayişindən sonra çıxış edənlərdən baş müəllim, t.ü.f.d. Sevil Bəhramova "Heydər Əliyev və Azərbaycanda dinlərarası dialoq" mövzusunda, Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Türkoloji Mərkəzin Türk tarixi bölməsinin müdiri, dosent Dəyanət Musayev "Türk dünyasının birliyinin möhkəmlənməsində Heydər Əliyevin rolu" mövzusunda məruzə ediblər. Pedaqoji Universitetin tələbələri adından söz alan ADPU TGT-nin Tarix və coğrafiya fakültəsi təşkilatının rəhbəri Cavad İsmayılzadə "Heydər Əliyev və Azərbaycanda gənclər siyasəti" mövzusunda çıxış edib. Sonda "Meh" ədəbi dərnəyinin üzvlərinin ifasında Səməd Vurğunun "Azərbaycan" şeirindən parça səsləndirilib.

# Ulu Öndər Heydər Əliyevin məzarı ziyarət edilib



Dekabrın 12-də Ulu Öndər Heydər Əliyevin vəfatının 20-ci ildönümü münasibəti ilə ADPU-nun müəllim və tələbə heyəti Fəxri Xiyabanda Ümummilli Lider Heydər Əliyevin məzarını ziyarət ediblər. Ziyarətdə Universitetin rəhbərliyi, fakültə dekanları, müvafiq strukturların rəhbərləri, professor-müəllim heyəti və fəal tələbələr iştirak ediblər.

Ziyarətdə Ulu Öndərin məzarı önünə əklil qoyulub, tər çiçəklər düzülüb. Eyni zamanda görkəmli ictimai xadim və oftolmoloq alim Zərifə xanım Əliyeva, görkəmli dövlət xadimləri Əziz Əliyev və Tamerlan Qarayevin də məzarları ziyarət olunub. Qeyd olunub ki, Ümummilli Lider Heydər Əliyev bugünkü qüdrətli və firavan Azərbaycanın memarı, xalqımızın qəlbində əbədi yaşayacaq misilsiz dühadır. 2023-cü il, eyni zamanda, Azərbaycanda "Heydər Əliyev İli" elan olunmuşdur və il ərzində böyük şəxsiyyətin 100 illik yubileyi ilə bağlı bütün ölkədə olduğu kimi Pedaqoji Universitetdə də silsilə tədbirlər, konfrans, simpozium və seminarlar, müsabiqə, olimpiada və sərgilər təşkil olunmuş, ilboyu ADPU-nun Heydər Əliyev Mərkəzi tərəfindən universitetin birinci tədris ili tələbələri arasında "Heydər Əliyev dərsləri" təşkil olunmuşdur.

# ADPU SABAH tələbəsi SAF 2023-də hakim kimi fəaliyyət göstərib




ADPU-nun SABAH qruplarının "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının V tədris ilinin tələbəsi Elmira Poladova Elm və Təhsil Nazirliyinin dəstəyi ilə 4-8 dekabr tarixlərində təşkil olunan SAF 2023 – Beynəlxalq STEAM Azərbaycan Festivalında Birinci Lego Liqası (FLL) araşdırma kateqoriyası üzrə hakim kimi Türkiyədən olan həmkarları ilə birgə iştirakçı komandaların qiymətləndirilməsində iştirak edib.

ADPU SABAH tələbələrindən Gülnar Qasımzadə, Sona Rüstəmova və Leyla Rəhimli isə festivalda könüllü fəaliyyəti göstərib.

# ADPU tələbələri IELS - Beynəlxalq Erkən Öyrənmə Tədqiqatının təşkilində iştirak edəcəklər



Dekabrın 12-13-də Pedaqoji Universitetin Strateji İnkişaf Mərkəzinin təşkilatçılığı ilə Universitetin Məktəbəqədər təhsil fakültəsində təhsil alan tələbələrlə infosessiya təşkil olunub. 200-ə yaxın tələbənin iştirakı ilə baş tutan görüşün məqsədi IELS – Beynəlxalq Erkən Öyrənmə Tədqiqatı haqqında tələbələri məlumatlandırmaq və tədqiqatın təşkili prosesinə cəlb etməkdir. Təqdimatla çıxış edən Pedaqoji Universitetin strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva ölkəmizin iştirak etdiyi beynəlxalq şagird qiymətləndirmə proqramları (PISA, PIRLS, TIMSS, ICILS) haqqında ümumi məlumat verərək təhsil siyasətinin formalaşdırılmasında bu tədqiqatların mühüm roluna diqqət çəkib. Tədqiqatların hesabatlarında erkən öyrənmənin, məktəbəqədər təhsilin şagird nailiyyətinə təsirinin önəminə dair məlumatlar əyani nümayiş olunub, müzakirələr aparılıb.

Daha sonra prorektor K.Pirverdiyeva ölkəmizin ilk dəfə iştirak edəcəyi IELS (International Early Learning and Child Well-being Study) - Beynəlxalq Erkən Öyrənmə Tədqiqatı barədə təqdimat edib. Qeyd edək ki, IELS – Beynəlxalq Erkən Öyrənmə Tədqiqatı beş yaşlı uşaqların öyrənməsinə təsir edən ev və ya uşaq bağçasındakı öyrənmə mühitlərini araşdırır. Burada beş yaşlıların ilkin savadlılıq, ilkin hesablama, özünü tənzimləmə və sosial-emosional bacarıqları ölçülür. İnfosessiya ərzində qiymətləndirmənin təşkili prosesinə maraq göstərən tələbələr qeydiyyat formunu doldurublar. 2024-cü ilin fevral ayı ərzində təşkil olunacaq IELS tədqiqatında ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin tələbələri təlimçi və imtahan koordinatoru kimi iştirak edəcəklər.

İnfosessiyanın sonunda mütaliəyə təşviq məqsədilə tələbələrə kitablar hədiyyə edilib.

# "Ümummilli Lider Heydər Əliyev - 100" mövzusunda tədbir keçirilib

Dekabrın 14-də ADPU-nun Magistratura və doktorantura şöbəsi və Xarici Dillər Mərkəzinin dosenti Qəribə Məmmədovanın birgə təşkilatçılığı ilə "Ümummilli Lider Heydər Əliyev - 100" mövzusunda tədbir keçirilib. Tədbirdə müəllimlər, şöbənin əməkdaşları, müxtəlif ixtisaslaşmalar üzrə təhsil alan magistrantlar iştirak ediblər. Magistratura və doktorantura şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov tədbiri giriş sözü ilə açaraq şöbədə son illərdə Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni ilin gəlişi ərəfəsində il ərzində qeyd olunan böyük yubileylərə həsr olunmuş tədbirin keçirilməsi ənənəsinin formalaşdığını bildirib. Vurğulanıb ki, "Heydər Əliyev İli"ndə xalqımızın çoxəsrlik tarixində ən vacib hadisələrdən biri baş verib – Müzəffər Ali Baş Komandan cənab İlham Əliyev Prezident vəzifəsinə seçilməsinin 20 illiyində tarixi torpaqlarımız olan Xankəndində, Xocalıda, Xocavənddə, Ağdərədə, Əsgəranda Dövlət bayrağımızı ucaldıb.

Tədbirdə "Təhsildə qiymətləndirmə və monitorinq" ixtisaslaşması üzrə I tədris ili magistrantları "Heydər Əliyevin həyatının ilk illəri", "Bir dahi doğulub gəlir dünyaya", "Heydər Əliyevin siyasi fəaliyyəti", "Heydər Əliyev və təhsil", "Heydər Əliyev və neft strategiyası" mövzularında Azərbaycan və ingilis dillərində çıxış ediblər. "Biologiya fənninin tədrisi metodikası və metodologiyası", "Kimya fənninin tədrisi metodikası və metodologiyası" və "Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fənninin tədrisi metodikası və metodologiyası" ixtisaslaşmaları üzrə II tədris ili magistrantları "Heydər Əliyevin hərbi kadrların hazırlanmasında rolu", "Heydər Əliyev və gənclərin Respublikadan kənarda təhsili", "Heydər Əliyev siyasətinin uğurlu davamı" mövzularında təqdimatlarla çıxış ediblər.



"Pedaqogika nəzəriyyəsi və tarixi", "Təhsildə sosial-psixoloji xidmət" ixtisaslaşmaları üzrə I tədris ili magistrantları Ümummilli Liderə həsr olunmuş şeirlər səsləndiriblər. Magistrantlar tərəfindən Ulu Öndər Heydər Əliyevin 100 kəlamı səsləndirilib.

Sonra tədbirin təşkilatçısı, dosent Qəribə Məmmədova yaradılan şəraitə görə Universitet rəhbərliyinə təşəkkürünü bildirib, Ulu Öndər Heydər Əliyevin şəxsiyyəti, onun dahiliyi haqqında fikirlərini səsləndirib, tələbəlik xatirələrini danışıb.

Sonda tədbir iştirakçıları "Xalq Heydər söyləyəcək" mahnısını səsləndiriblər. Onu da qeyd edək ki, dekabrın 12-də – Ulu Öndər Heydər Əliyevin anım günündə magistratura səviyyəsində birinci dərslərin bir hissəsi dahi rəhbərin həyat və fəaliyyətinə həsr olunub.

# ADPU-nun 3 tələbəsi "Heydər Əliyev adına təqaüd"ə layiq görülüb

Pedaqoji Universitetin 3 tələbəsi – Riyaziyyat fakültəsinin "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının II kurs tələbəsi Tağızadə Zümrüd Cəbrayıl qızı, SABAH qruplarının "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının IV kurs tələbəsi Məmmədova Nuray Məhər qızı və İbtidai təhsil fakültəsinin "İbtidai sinif müəllimliyi" ixtisasının IV kurs tələbəsi Rzazadə Ləman Mehti qızı Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 iyun 2023-cü il tarixli 3940 nömrəli Sərəncamı ilə təsis edilmiş "Heydər Əliyev adına təqaüd"ə layiq görülüblər.

Dekabrın 16-da Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş Azərbaycan Müəllimlərinin XVI Qurultayında müxtəlif ali təhsil müəssisələrində təhsil alan ən yüksək təhsil göstəriciləri olan 100 nəfər tələbəyə "Heydər Əliyev adına təqaüd"ün təqdimetmə mərasimi keçirilib.

Dekabrın 19-da isə ADPU-nun rektoru, professor Cəfər Cəfərov "Heydər Əliyev adına təqaüd"ə layiq görülən tələbələrlə görüşüb. Görüşdə, həmçinin tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev və Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli iştirak edib.

Rektor C.Cəfərov vurğulayıb ki, Ulu Öndərin 100 illik yubileyinə həsr olunan bu mötəbər mükafata layiq görülmələri Universitetin və onların həyatında əlamətdar hadisədir. Eyni zamanda, bu yüksək mükafat tələbələri yeni-yeni nailiyyətlər əldə etməyə, ixtisaslarının dərinliklərini və innovativ yanaşmaları mənimsəmək və tətbiq etmək yolunda durmadan çalışmağa sövq edən motivasiya mənbəyidir. Bildirilib ki, elmin və təhsilin






inkişafı, gənclərin hər sahədə dəstəklənməsi bu gün cənab Prezident İlham Əliyev tərəfindən icra olunan dayanıqlı inkişaf siyasətinin əsas xətlərindəndir.

Təqaüdə layiq görülən tələbələr öz təəssüratlarını bölüşərək onların əməyinə verilən bu ali dəyərə görə Ölkə başçısı cənab İlham Əliyevə minnətdarlıqlarını ifadə edərək, elm və təhsilimizin inkişafına töhfə vermək üçün əzmlə çalışacaqlarını, onlara göstərilən etimadı doğrultmaq üçün əllərindən gələni əsirgəməyəcəklərini bildiriblər.

Qeyd edək ki, ilk dəfə təqdim edilən bu təqaüd ölkə üzrə bakalavriat səviyyəsində təhsil alan və ən yüksək təhsil göstəriciləri olan 100 nəfər tələbəyə verilir. 3000 AZN dəyərindəki "Heydər Əliyev adına təqaüd" birdəfəlik qaydada verilir.

# "Rəngli dünyamız" rəsm dərnəyində növbəti dərs

Dekabrın 16-da ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) nəzdində fəaliyyət göstərən "Rəngli dünyamız" Rəsm dərnəyinin növbəti dərsi keçirilib. Artıq 2 ildir ki fəaliyyət göstərən rəsm dərnəyində keçirilən dərslər tələbələr tərəfindən çox maraqla qarşılanır. Dərnəyin məqsədi müxtəlif fakültələrdə təhsil alan rəsm qabiliyyətli tələbələrlə birlikdə maraqlı vaxt keçirmək, eyni zamanda bu qabiliyyəti onlarda daha da inkişaf etdirməkdə dəstək olmaqdır.



# Nəvai adına Dövlət Pedaqoji İnstitutu ilə əməkdaşlıq müqaviləsi imzalanıb



Özbəkistan Respublikasının Əlişir Nəvai adına Dövlət Pedaqoji İnstitutunun nümayəndə heyətinin Pedaqoji Universitetin tələbələri ilə görüşü keçirilib.

İnstitutun dekanı Dilara Şamıyeva, kafedra müdiri Feruza Jumayeva və dosent Gülsanam Horovadan ibarət heyəti, əvvəlcə, ADPU-nun rektoru, professor Cəfər Cəfərov və elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov qəbul edib.

Daha sonra Pedaqoji Universitetin professor-müəllim və tələbə kollektivi ilə görüş keçirilib. Görüşdə hər iki ali təhsil ocağının fəaliyyəti haqqında geniş məlumat verilib. Qonaqlar 2017-ci ildən fəaliyyət göstərən Türksoy kafedrasının fəaliyyəti ilə tanış olublar.

Yekunda ADPU ilə Əlişir Nəvai adına Dövlət Pedaqoji İnstitutu arasında elm və təhsil sahəsində əməkdaşlığa dair müqavilə imzalanıb.

# Kitab təqdimatı: "Heydər Əliyev irsi və müasir Azərbaycanın inkişafının bəzi məsələləri"





Dekabrın 20-də ADPU-nun Elmi-tədqiqat mərkəzinin (ADPU ETM) əməkdaşlarının "Heydər Əliyev İli" çərçivəsində hazırladıqları "Heydər Əliyev irsi və müasir Azərbaycanın inkişafının bəzi məsələləri" adlı məqalələr toplusunun təqdimat mərasimi keçirilib. Kitab Ümummilli Lider Heydər Əliyevin zəngin irsinin öyrənilməsinə həsr olunub. Məqalələrdə Ulu Öndərin Azərbaycanın iqtisadi-siyasi və mədəni-humanitar həyatında çoxşaxəli fəaliyyətinin bəzi mühüm aspektləri tədqiq edilir. Kitabın ön söz müəllifi ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, elmi redaktoru isə Universitetin Elmi-tədqiqat mərkəzinin müdiri, dosent Ərəstun Mehdiyevdir. Toplu ADPU Elmi Şurasının 18 iyul 2023-cü il tarixli 8 saylı qərarı ilə nəşr edilib.

Tədbirdə çıxış edənlərdən ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, prof. Asəf Zamanov, Elmi-təşkilati şöbənin müdiri, prof. İbrahim Bayramov, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, prof. Fərrux Rüstəmov, ETM-in müdiri, dos. Ərəstun Mehdiyev, Azərbaycan tarixi kafedrasının müdiri, dos. Naibə Əhmədova Ümummilli Lider Heydər Əliyevin müstəsna xidmətlərindən bəhs etmiş, təqdim olunan kitabı Ulu Öndərin 100 illik yubileyinə töhfə kimi qiymətləndirmişlər.

# ADPU tələbələri "Yüksəliş" qalibləri ilə mentorluq proqramında iştirak edir




Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə istedadlı kadrların seçilməsi və inkişaf etdirilməsi, eləcə də kadr bankının yaradılması məqsədi ilə keçirilən "Yüksəliş" müsabiqəsində 2020-2021, 2022 və 2023-cü illərdə ümumilikdə 26.362 nəfər iştirak etmiş və 71 nəfər qalib gəlmişdir. Ölkədə mentorluq mədəniyyətinin inkişaf etməsi və yeni nəsil idarəçilərin yetişdirilməsində davamlılığın təmin edilməsi məqsədi ilə "Yüksəliş" müsabiqəsi qaliblərinin mentorluq proqramı çərçivəsində qazandığı təcrübəni universitet tələbələri ilə bölüşməsi məqsədəuyğun görülmüşdür. Tələbələr üçün keçirilən mentorluq proqramının əsas məqsədi III və IV kurs tələbələrinin "Yüksəliş" müsabiqəsinin qaliblərinin idarəçilik təcrübəsindən yararlanmasını və gələcək karyera fəaliyyəti ilə bağlı tövsiyələr almasını təmin etməkdir. Qaliblər tərəfindən keçirilən bir illik mentorluq proqramına Pedaqoji Universitetin fəal tələbələri İsmayıl Nəsirov, Təhməsib İmaməliyev, Nərgiz Quluzadə, Camilə Qurbanova, Aygül Əliyeva və Günay Tairli də seçilmiş və proqrama cəlb edilmişdir. Proqram çərçivəsində tələbələrin qaliblərlə görüşləri keçirilib, fikir mübadiləsi aparılıb.

Qeyd edək ki, proqramın sonunda "Yüksəliş" müsabiqəsinin qalibləri tərəfindən tələbələrə tövsiyə məktubu təqdim ediləcək.

# ADPU-nun müəlliminin rəsmləri TÜRKSOY-un sərgisində nümayiş olunub



Pedaqoji Universitetin İncəsənət və fiziki tərbiyə fakültəsinin Təsviri incəsənət və onun tədrisi texnologiyası kafedrasının müəllimi, rəssam Səyyar Əliyev noyabrın ayında Şuşa Şəhəri Dövlət Qoruğu İdarəsi və TÜRKSOY-un birgə təşkilatçılığı ilə "Ankarada Şuşa mədəniyyət günləri" çərçivəsində TÜRKSOY-un baş ofisində keçirilən şuşalı rəssamların şəhərin tarixini, özünəməxsus təbiətini, gözəlliyini özündə əks etdirən rəsm əsərlərinin sərgisində iştirak edib. Rəssamın Şuşaya həsr olunan əsərləri maraqla qarşılanıb.

# Seminar: Bullinq hallarının tədrisə təsiri




Dekabrın 20-də ADPU-nun SABAH qruplarının müəllim və tələbə heyəti üçün təhsil mütəxəssisi İlkin Həsənovun təqdimatında "Bullinq hallarının tədrisə təsiri" mövzusunda seminar keçirilib. Seminarda bullinq hallarının sinif mühitinə, öyrənmə prosesinin effektivliyinə təsiri, eləcə də, bu halların başvermə səbəbləri, qarşısının alınması yolları, ailələrlə iş və s. məsələlərə toxunulub. Böyük marağa səbəb olan seminarda mövzu ətrafında maraqlı diskusiya təşkil edilib.

# Təlim: Dil və ədəbiyyat sahəsində müəllim hazırlığı – Avropa perspektivində



ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-Tədris Mərkəzi tərəfindən "Pedaqoji kadr hazırlığında Avropa təhsil sisteminin araşdırılması və beynəlxalq təcrübəyə əsaslanan yeni məzmunlu təhsilin Azərbaycanda pedaqoji yönümlü universitet və kolleclərin filoloji fakültələrində tətbiqi" adlı qrant layihəsi çərçivəsində Azərbaycan Elm Fondunun maliyyə dəstəyi ilə (Qrant № AEF-MCG-2022-1(42)-12/12/5-M-12) "Dil və ədəbiyyat sahəsində müəllim hazırlığı - Avropa perspektivində" mövzusunda iki günlük təlim keçirilib.

"Beynəlxalq təcrübəyə əsaslanan tədris planlarının tərtibatı" və "Almaniya təcrübəsində müəllim hazırlığı" istiqamətlərini əhatə edən interaktiv təlim ADPU-nun Xarici Dillər Mərkəzinin müdiri, dosent Ülviyyə Hacıyeva və f.ü.f.d., baş müəllim Mirvari Qasımova tərəfindən keçirilib.

# ADPU-nun 26 tələbəsinə IELTS sertifikatı təqdim olundu



Dekabrın 21-də Pedaqoji Universitetdə Təhsilin İnkişafı Fondu (TİF) və Britaniya Şurası ilə ("British Council", BŞ) tərəfdaşlıq əsasında artıq ikinci dəfə təşkil olunan IELTS (International English Language Testing System) imtahanlarında iştirak edən Universitetin bir qrup tələbələrinə sertifikatların təqdim olunması mərasimi keçirilib. Mərasimdə ADPU-nun rəhbərliyi, Filologiya fakültəsinin professor-müəllim heyəti ilə yanaşı, TİF və BŞ-nin nümayəndələri iştirak ediblər.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, Pedaqoji Universitetdə təhsilverənlərin və tələbələrin dil və İT bacarıqlarının təkmilləşdirilməsi istiqamətində ardıcıl layihələr icra olunur. Bu baxımdan IELTS imtahanlarına hazırlıq və imtahanların keçirilməsi də xüsusi əhəmiyyətə malikdir.

Rektor vurğulayıb ki, ilk dəfə ötən tədris ilində reallaşdırılan layihədə 19 nəfər iştirak etmişdisə, artıq bu il ADPU-nun 26 tələbəsi layihədə iştirak edərək, müvafiq hazırlıqlardan keçdikdən sonra imtahanlardan uğurla keçərək IELTS sertifikatları qazanıblar. Tələbələri təbrik edən prof. C.Cəfərov layihənin davamlı olacağına inamını ifadə edib. `

Britaniya Şurasının Azərbaycan üzrə direktoru Nərgiz Hacıyeva bildirib ki, Şuranın 5 regional mərkəzindən biri məhz Azərbaycanda yerləşir. Direktor 4 mindən çox orta məktəb müəlliminin onlayn ingilis dili inkişafı proqramına cəlb olunduğunu diqqətə çatdırıb. N.Hacıyeva qeyd edib ki, ADPU ilə BŞ arasında uzunmüddətli səmərəli əməkdaşlıq mövcuddur və bu əməkdaşlıq təkcə dil biliklərinin artırılması sahəsində deyil, eyni zamanda ingilis dili üzrə proqramların, milli kurikulumun hazırlanması kimi akademik sahələrdə də uğurla davam etdirilir. Vurğulanıb ki, TİF-in dəstəyi ilə ali məktəb müəllimləri və tələbələri üçün təşkil olunan IELTS imtahanları artıq iki ildir davam edir və layihəyə cəlb olunan ADPU tələbələri çox uğurlu nəticələr göstərirlər.

Təhsilin İnkişafı Fondunun İdarə Heyətinin sədr müavini Xanım Daşdəmirova da öz növbəsində Fondun fəaliyyət istiqamətlərinə uyğun olaraq TİF-in bir ildən çoxdur bu layihəyə dəstək göstərdiyini və indiyədək layihə çərçivəsində 7 ali təhsil müəssisəsindən ümumilikdə 200-dək tələbə və təhsilverənlərin yararlandığını diqqətə çatdırıb. `

Daha sonra layihədə iştirak edərək uğur qazanmış tələbələrə IELTS sertifikatları təqdim olunub, onların təəssüratları dinlənilib.

# Filologiya fakültəsinin Heydər Əliyevin 100 illiyi münasibəti ilə hazırladığı 6 kitab təqdim olunub

Dekabrın 21-də ADPU-nun Filologiya fakültəsinin əməkdaşları tərəfindən Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi münasibəti ilə hazırlanmış 6 kitabın təqdimat mərasimi keçirilib. Təqdimat mərasimində Pedaqoji Universitetin rəhbərliyi və professor-müəllim heyəti ilə yanaşı millət vəkilləri və tanınmış ziyalılar iştirak ediblər.

Tədbirdə ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynovanın "Baxış bucağı: Heydər Əliyev və strateji azərbaycançılıq", prof. Mahirə Hüseynova və prof. Sayalı Sadıqovanın "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf konsepsiyası", Filologiya fakültəsinin dekanı, dosent əvəzi Könül Həsənova və dos. Nazilə Abdullazadənin "Zəkanın və milli yaddaşın təntənəsi" (Azərbaycan və ingilis dillərində), prof. Təyyar Salamoğlu və dos. Razim Məmmədovun "Ümummilli Liderin ədəbiyyat strategiyası", prof. Təyyar Salamoğlunun "Ədəbiyyat və siyasət" və prof. Elman Quliyevin



"Haydar Aliyev ve türk dünyası" (türk dilində) kitabları təqdim olunub.

Prof. Mahirə Hüseynovanın moderatorluğu ilə keçirilən təqdimat mərasimində çıxış edənlərdən ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, millət vəkilləri Məlahət İbrahimqızı, Şahin İsmayılov, Naqif Həmzəyev, Azərbaycan Respublikasının Auditorlar Palatasının sədri, prof. Vahid Novruzov, AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun Terminologiya şöbəsinin müdiri, prof. Sayalı Sadıqova, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, prof. Asəf Zamanov, müəlliflər və digərləri Ümumilli Lider Heydər Əliyevin xatirəsinə həsr olunmuş kitabların əhəmiyyətindən, hazırlanan əsərlərdə elmi tədqiqata cəlb olunan əsas məsələlərdən söz açaraq ADPU-nun Filologiya fakültəsinin kollektivinə təşəkkürlərini bildirib və bu əsərləri ali məktəblərdə Heydər Əliyev irsinin tədqiqi işinə dəyərli töhfə kimi qiymətləndiriblər.

# ADPU-da Mustafa Aydının seminarı: Uğur üçün təhsildə liderlik: İdarəetmənin açarı



Dekabrın 22-də ADPU-da "EduTime" Təhsil və İnkişaf Mərkəzi, ADPU, Azərbaycan Gənc Müəllimlər Assosiasiyası (AGMA) və İslahatçı Gənclər İctimai Birliyinin təşkilatçılığı ilə Türkiyənin tanınmış təhsil adamlarından olan, İstanbul Aydın Universitetinin təsisçisi və Avrasiya Universitetlər Birliyinin sədri Mustafa Aydın "Uğur üçün təhsildə liderlik: İdarəetmənin açarı" mövzusunda seminar keçib.

Seminarda ADPU rəhbərliyi, təhsil ictimaiyyəti və media nümayəndələri ilə yanaşı təhsilin bütün pillərində çalışan 300-dək təhsil işçisi və tələbə iştirak edib. Əvvəlcə, Ulu Öndər Heydər Əliyevin və şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Giriş sözü ilə çıxış edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, Azərbaycan xalqının Ümummilli Lideri Heydər Əliyevin və Türkiyə Respublikasının 100 illik yubileylərinə həsr olunan seminar Ulu Öndərin "Bir millət, iki dövlət" konsepsiyasının və Qazi Mustafa Kamal Atatürkün "kədəriniz kədərimiz, sevinciniz sevincimizdir" amalının günümüzdə təhsil sahəsində davamının, türk xalqlarının qardaşlığı və hər sahədə əməkdaşlığının daha bir göstəricisidir.

Prof. C.Cəfərov bildirib ki, Pedaqoji Universitetdə qardaş Türkiyənin, eləcə də digər qabaqcıl ölkələrin tanınmış təhsil adamlarının müasir yanaşmalarla bağlı təcrübələrini öyrənmək istiqamətində silsilə tədbirlər təşkil olunur, dəyişən dünyanın təhsil trendlərinin öyrənilməsi, tədqiqi və tətbiqi ilə bağlı fəal iş aparılır.

Rektor vurğulayıb ki, Türkiyənin tanınmış təhsil təşkilatçılarından olan Mustafa Aydının seminarı da bu baxımdan xüsusilə əhəmiyyət kəsb edir.

Daha sonra Mustafa Aydın "Uğur üçün təhsildə liderlik: İdarəetmənin açarı" mövzusunda məruzə ilə çıxış edib. Alim və ictimai xadim xüsusilə vurğulayıb ki, çağdaş dünyada milli təhsil sistemində, şagirdlərin və tələbələrin yetişdirilməsində təməl elmi-texniki bilik və bacarıqlarla yanaşı dəyərlər sisteminin öyrədilməsi, milli kimlik tərbiyəsinin olduqca önəmli rolu var. "Dəyərlər əsasında qurulmayan təhsilin məhsulu olan gənclər digər ideoloji fikirlərin daşıyıcılarına çevirilərək vətəni və xalqına fayda verməkdən asanlıqla yayındırıla bilinər." - deyə M.Aydın qeyd edib.

Mustafa Aydın özünün milli təhsil baxışlarının ikinci əsas elementinin isə yetişdirilən uşaqlarda, gənclərdə 'öyrədilmiş çarəsizlik" şüurunun aradan qaldırılması olduğunu diqqətə çatdırıb. Qeyd edib ki, uzun illər ərzində gənclərə və ümumilikdə ictimai şüura təlqin olunmuş "siz edə bilməzsiniz", "sən yarada bilməzsən", "sən əziyyət çəkmə, hazır məhsuldan istifadə et" kimi tezislərin dağıdıcı təsirlərini aradan qaldırmaq üçün bu gün gənclərimizə tədris və təlim prosesini "sən bacararsan" təməli üzərinə daşımalı, milli kimlik və tarixi kök, irsə məhəbbət əsasında öz çağdaş baxışımızı yarada biləcəyimiz aşılanmalıdır. Gənclər milli mənsubiyyətindən, adət-ənənələrindın utanmamalı, yeniliyi yad mədəniyyətlərin təqlid olunmasında axtarmamamlıdırlar. Spiker vurğulayıb ki, bu xüsusda müəllim və valideynlərimiz övladlarının xarici dillərdə, ən yaxşı xarici universitetlərdə təhsil almalarını arzulamaqla yanaşı, bu incə tarazlığı daim diqqətdə saxlamalıdırlar. Seminar iştirakçıları maraqlandıran sualların cavablandırılması ilə davam etdirilib.

## "Sarı gəlinin sorağında" filminin təqdimatı



Dekabrın 21-də Pedaqoji Universitetin Heydər Əliyev Mərkəzində Azərbaycan Respublikasının Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Agentliyinin maliyyə dəstəyi ilə Azərbaycan Kinematoqrafçılar İttifaqının həyata keçirdiyi "Qərbi Azərbaycan: maddi və mədəni irsimiz" layihəsi çərçivəsində hazırlanmış www.western-azerbaijan.az saytının və "Sarı gəlinin sorağında" adlı tammetrajlı sənədli filmin təqdimat mərasimi keçirilib. Mərasimdə İttifaqın və Mərkəzin rəhbərliyi, ADPU-nun professor-müəllim heyəti və tələbələri iştirak edib.

Xatırladaq ki, süjet xətti "Sarı gəlin" xalq mahnısının və Hikmət Babaoğlunun "Akdamardan Sarı Gəlinədək erməni yalanı" əsərinin motivləri üzərində qurulan "Sarı gəlinin sorağında" sənədli filminin yaradıcılarının əsas məqsədi Qərbi Azərbaycan ərazisindəki maddi-mədəni irsimizin təbliği, son 200 ilə yaxın dövrdə ermənilərin bu irsin məhv edilməsi yönündəki fəaliyyətlərinin ifşasıdır. Qeyd edək ki, filmin ssenari müəllifi Füzuli Sabiroğlu, rejissoru Mübariz Nağıyev, elmi məsləhətçiləri Qərbi Azərbaycan İcması İdarə Heyətinin sədri, f.f.d. Əziz Ələkbərli və AMEA Tarix İnstitutu Qərbi Azərbaycan tarixi şöbəsinin müdiri t.f.d. Cəbi Bəhramovdur.

## Pedaqoji Universitet Avrasiya Universitetlər Birliyinə üzv olub



Dekabrın 22-də Pedaqoji Universitetdə İstanbul Aydın Universitetinin (İAU) nümayəndələri ilə görüş keçirilib. Görüşdə ADPU-nu universitetin rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, beynəlxalq əlaqələr üzrə prorektor, prof. Mahirə Hüseynova və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, İAU-nu isə universitetin rektoru və Avrasiya Universitetlər Birliyinin (EURAS) prezidenti Mustafa Aydın, EURAS üzrə prezidentin müşaviri İrem Arman, EURAS-ın baş direktoru və İAU-nun administratoru Səbinə Hüseynova, EURAS prezidentinin köməkçisi Tuğçe Koçkat, İAU-nun Azərbaycan ofisinin təmsilçisi Ceyhun Qaşəmli və ofisin əməkdaşı Xədicə Karataş təmsil edib.

Görüşün yekununda rektorlar prof. Cəfər Cəfərov və Mustafa Aydın universitetlər arasında qarşılıqlı əməkdaşlığa dair memorandum və EURAS-a üzvlüyə dair müqavilə imzalayıblar.

## Pedaqoji Kollecdə tədbir: 30 il həsrət – 30 il zəhmət



ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində Ulu Öndər Heydər Əliyevin 100 illik yubileyi və Vətən müharibəsindəki tarixi qələbəmiz münasibəti ilə kollecdə 30 ildən artıq fəaliyyət göstərmiş müəllimlərlə "30 il həsrət - 30 il zəhmət" mövzusunda görüş keçirilib.

Tədbirdə kollecin təqaüdçü müəllimlərindən Z.Şirəliyeva, A.Ağazadə, R.Novruzova və M.Hüseynova qonaq qismində iştirak ediblər. Tədbirdə Xalq artisti, Mədəniyyət və İncəsənət Universitetinin professoru Məmmədsəfa Qasımovun ifasında Prezident İlham Əliyevə doğum günü təbriki səsləndirilib, Müzəffər Ali Baş Komandanın yorulmaz əməyi sayəsində ölkəmizin sosial-iqtisadi sahədə, dövlət quruculuğunda və beynəlxalq aləmdə qazandığı uğurlar və Vətən müharibəsində tarixi qələbəmizdən bəhs edilib. Tədbirdə ifa edilən müxtəlif şeir, rəqs və mahnı nümunələri, II Qarabağ müharibəsi ilə bağlı videoçarxlar, dahi şəxsiyyətlərin, Qarabağ müharibəsində qəhrəmanlıq göstərən gənclərin, savadlı nəslin formalaşmasında müəllimin əməyinin müstəsna rolununun xüsusi qeyd olunması tədbir iştirakçılarında xoş ovqat yaradıb. I Qarabağ müharibəsində Zəngilandan məcburi köçkün düşmüş bir müəllimin həyat hekayəsindən bəhs edən tamaşa maraqla qarşılanıb.

# Pedaqoji Universitetdə bayram şənliyi keçirilib



Dekabrın 25-də Pedaqoji Universitetdə İncəsənət və fiziki tərbiyə və Tarix və coğrafiya fakültələrinin birgə təşkilatçılığı ilə Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il bayramı münasibəti ilə bayram şənliyi keçirilib. Tədbirdə Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Asif Axundov, İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı, dosent Anar Fərmayılov, eləcə də professor-müəllim və tələbə kollektivi iştirak edib.

Açılış nitqi söyləyən rektor, prof. Cəfər Cəfərov əlamətdar bayramlar münasibətilə müəllim və tələbələri təbrik edib və gələcək fəaliyyətlərində uğurlar arzulayıb.

Tədbirdə tələbələrin təqdimatında mahnılar ifa olunub, şaxta baba ilə qar qızın gəlişi tədbirə özünəməxsus rəng qatıb.

# ADPU-nun prorektoru forumda əsas spiker kimi təqdimat edib




Dekabrın 21-də Naxçıvan şəhərində Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunan "İbtidai Sinif Müəllimlərinin Naxçıvan Forumu" keçirilib.

Forumun açılışında Naxçıvan Muxtar Respublikasında Azərbaycan Respublikası Prezidentinin səlahiyyətli nümayəndəsi Fuad Nəcəfli çıxış edib.

Naxçıvan Muxtar Respublikası Təhsil Nazirliyi, Naxçıvan Gənclər Fondu, Azərbaycan Gənc Müəllimlər Assosiasiyası, "Çinar Yayımları" nəşriyyatı, Azərbaycan Kitab, Maarif və Poliqrafçılar İctimai Birliyinin təşkilatçılığı, Azərbaycan Dövlət Pedaqoji Universiteti, "Təhsil" Nəşriyyatı və "Everest" nəşriyyat evinin rəsmi tərəfdaşlığı ilə keçirilən forumda 900-dən çox ibtidai sinif müəllimi iştirak edib. Naxçıvanda ilk dəfə olaraq keçirilən İbtidai Sinif Müəllimlərinin Naxçıvan Forumunda müəllimlərin inkişafına dəstək olmaq, onları maarifləndirmək üçün Pedaqoji Universitetin mütəxəssislərindən ibarət spikerlər tərəfindən maraqlı mövzularda təqdimatlar edilib. Belə ki, ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva Universitetin rəhbərliyi və professor-müəllim heyəti adından forum iştirakçılarını salamlayıb, "Bilik oxumaqdan, hikmət anlamaqdan başlayır" mövzusunda təqdimat edib. Təqdimatda PIRLS – Oxu Nailiyyətlərinin Qiymətləndirilməsi üzrə Beynəlxalq Tədqiqatın 2016 və 2021-ci illər üçün ölkə üzrə müqayisəli nəticələri təqdim edilib. Bu tədqiqat əsasında şagirdlərdə oxu səriştələrinin artırılmasına təsir edən amillər, ev və məktəb mühitinin formalaşdırılmasını dəstəkləyən oxunun tədrisi strategiyaları və müxtəlif metodologiyalar qeyd edilib.

Daha sonra Pedaqoji Univeristetin müəllimləri Yuliya Kərimova "İbtidai siniflərdə şagirdyönümlü olmaq nə deməkdir?" və Leyla Abbaslı "Öyrənmənin qiymətləndirilməsi, yoxsa öyrənmə üçün qiymətləndirmək" mövzularında təqdimat ediblər. Spikerlərin çıxışları təhsilin önəmi, bununla bağlı atılan addımlar və müxtəlif yanaşmalarla bağlı dinləyicilərin yeni, faydalı məlumatlar almasına kömək edib.

# Bakı məktəbliləri Pedaqoji Universitetdə ekskursiyada



Dekabrın 25-də Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi ilə bağlı universitet-məktəb əlaqələrinin tənzimlənməsi çərçivəsində Bakı şəhərində yerləşən 119 və 215 nömrəli tam orta məktəbin kimya müəllimləri Azadə Hənifəyeva və Vəfa Kərimli həvəskar şagirdləri ilə birgə ADPU-da ekskursiyada olublar.

Məktəb kollektivlərini Universitetin Tədris Departamentinin Məzun Koordinasiya və Karyera şöbəsinin müdiri Könül Əsgərova və Kimya və biologiya fakültəsinin baş müəllimi Rumiyyə Camalova qarşılamış, şagirdlərlə görüşən elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Tədris Departamentinin müdiri, dosent Sənan Əliyev, Kimya və biologiya fakültəsinin dekanı, dosent Reyhan Ağayeva, dekan müavini, dosent Kərim Quliyev və kafedra müdiri, dosent Kəmalə İskəndərova öz tövsiyələrini verib, kitablar hədiyyə ediblər. Şagirdlər Kitabxana-İnformasiya Mərkəzi, kimya laboratoriyaları və zoologiya muzeyi ilə tanış olub, mühazirədə iştirak edib, tələbələrin Pedaqoji Universiteti seçmələri ilə bağlı təəssüratlarını dinləyiblər.

## ADPU Gənc Məzunlar Assosiasiyası "Sinfin idarə olunması" mövzusunda təlim keçirib



Dekabrın 26-da ADPU Gənc Məzunlar Assosiasiyasının (ADPU GMA) təşkilatçılığı ilə "Sinfin idarə olunması" mövzusunda təlim keçirilib. ADPU-nun Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri, ADPU GMA-nın Nəzarət-Təftiş Komissiyasının sədri Turan Kərimli giriş sözü ilə çıxış edərək, yeni yaranmasına baxmayaraq, Assosiasiyanın qısa zaman ərzində məzunlar və tələbələr arasında təcrübə mübadiləsinin təşkili, qarşılıqlı əlaqələrin qurulması sahəsində bir sıra işlər gördüyünü diqqətə çatdırıb.

Təlimdə Azərbaycan Gənc Müəllimlər Assosiasiyasının (AGMA) İdarə Heyətinin sədri Rüfət Əsədzadə və ADA məktəbinin müəllimi, ADPU-nun bakalavr, Çinin Zhejiang Normal Universitetinin magistr məzunu Səkinə Həsənova şəxsi müəllimlik təcrübələri əsasında şagirdlərə yanaşma, səmimi sinif mühitinin, qarşılıqlı hörmət və etimadın yaradılması yolları haqqında məlumat veriblər.

# Pedaqoji Universitetdə Xalq şairi Sabir Rüstəmxanlı ilə görüş keçirilib




Dekabrın 27-də ADPU-da Beynəlxalq əlaqələr üzrə prorektorluq və Filologiya fakültəsinin təşkilatçılığı ilə Milli Məclisin deputatı, Xalq şairi Sabir Rüstəmxanlı ilə görüş keçirilib. Görüşdə ADPU-nun rəhbərliyi, prorektorlar, fakültə dekanları və müvafiq struktur bölmələrin rəhbərləri, o cümlədən fakültənin professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Görüşü giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov görkəmli şair və ictimai xadim olaraq Sabir Rüstəmxanlının Azərbaycan dövlətçiliyi, adət-ənənələri, elm və mədəniyyəti, ədəbiyyatının inkişafı və təbliğindəki roluna diqqət çəkib. Daha sonra şairin həyat yolu və yaradıcılığının əsas məqamlarının əks olunduğu videoçarx nümayiş olunub. Məruzə ilə çıxış edən prof. Təyyar Salamoğlu, prof. Elman Quliyev, prof. Yaqub Babayev və dos. Qüdrət Umudov S.Rüstəmxanlının yaradıcılığının zənginliyi və poeziyasının incəliklərindən söz açaraq, şairin yaradıcılığının milli səciyyəsini vurğulamış, onunla bağlı xatirələrindən danışmışlar. Bədii hissədə "Meh" ədəbi dərnəyinin qiraətçilərinin ifasında şairin şeirləri ifa olunub, şeirlərinə bəstələnmiş mahnılar fakültənin məzunu, müğənni Məxfirət Əlişanovanın ifasında təqdim olunub. Tələbələrin suallarını cavablandırdıqdan sonra çıxış edən Xalq şairi Sabir Rüstəmxanlı dəvətə görə ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, prof. Mahirə Hüseynovaya və fakültə dekanı, fil.ü.f.d., dosent əvəzi Könül Həsənovaya təşəkkür edib, müəllim və tələbələrin görüşündə olmaqdan məmnunluğunu ifadə edib.

Sonda prof. Mahirə Hüseynova Sabir Rüstəmxanlının ictimai-siyasi fəaliyyətinin milli-vətənpərvərlik ruhunun təbliğinə və xalqın tərəqqisinə xidmət etdiyini diqqətə çatdıraraq, şairə yeni-yeni uğurlar arzulayıb, dəvəti qəbul etdiyinə görə təşəkkürünü bildirib.

# IELS - Beynəlxalq Erkən Öyrənmə Tədqiqatı ilə bağlı məlumatlandırma seminarı



Dekabrın 27-də ADPU-nun Strateji İnkişaf Mərkəzi (ADPU SİM) tərəfindən IELS – Beynəlxalq Erkən Öyrənmə Tədqiqatı ilə bağlı məlumatlandırma seminarı təşkil olunub.

Məlumatlandırma seminarında Bakı və Sumqayıt şəhərlərindən tədqiqata cəlb olunan məktəbəqədər təhsil müəssisələrinin tərbiyəçiləri iştirak ediblər. 100-ə yaxın tərbiyəçinin iştirak etdiyi seminar iki sessiyada fərqli qruplarla təşkil olunub.

Görüşdə məktəbəqədər təhsilin, erkən öyrənmənin uşaqların inkişafındakı rolu, ölkəmizin öncəki illərdə iştirak etdiyi beynəlxalq tədqiqatların hesabatları barədə danışılıb. Bu hesabatlarda məktəbəqədər təhsil ilə bağlı çağırışlar diqqətə çatdırılıb. Bunlarla yanaşı, IELS beynəlxalq tədqiqatının məhz 5 yaşlı uşaqları əhatə etməsinin önəmi və səbəbləri müzakirə edilib.

Ölkəmizin ilk dəfə iştirak edəcəyi tədqiqat əsasında 5 yaşlılarda ölçülməsi nəzərdə tutulan 4 əsas bacarıq - ilkin savadlılıq, ilkin hesablama, özünü tənzimləmə və sosial-emosional bacarıqları özündə əks etdirən oyun əsaslı fəaliyyətlər haqqında məlumatlar tərbiyəçilərin diqqətinə çatdırılıb və birlikdə fikir mübadiləsi aparılıb.

# Professor Məmməd Qarayevin 90 illiyi



Dekabrın 28-də ADPU-da Kimya və biologiya fakültəsinin Fiziologiya kafedrasının sabiq professoru, biologiya elmləri doktoru Məmməd Abbas oğlu Qarayevin 90 illik yubileyi münasibəti ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, prof. Cəfər Cəfərov prof. M.Qarayevi təbrik edib və uzun müddət Pedaqoji Universitetdə göstərdiyi səmərəli elmi-pedaqoji fəaliyyətə görə təşəkkürünü bildirib. Prof. Məmməd Qarayevə ADPU rəhbərliyi və ADPU Həmkarlar İttifaqı Komitəsi adından təşəkkürnamələr və hədiyyə təqdim olunub. Daha sonra görüş səmimi söhbət şəraitində davam etdirilib. Qocaman müəllim ona göstərilən diqqətə görə Universitetin rəhbərliyinə minnətdarlığını bildirib və vurğulayıb ki, ADPU-da daim əməkdaşlara qarşı yüksək diqqət göstərilir. Qeyd edək ki, 90 illik həyat yolunun 60 ilini Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə bağlı olan prof. Məmməd Qarayev 1951 – 1957-ci illərdə V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun (hazırkı ADPU) Bədən tərbiyəsi fakültəsini bitirib. Bir neçə monoqrafiya, dərslik və dərs vəsaitlərinin, elmi məqalələrin müəllifidir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ




## ELMİ SEMİNAR: AZƏRBAYCANDA PEDAQOJİ TƏHSİLİN İNKİŞAF PERSPEKTİVLƏRİ



Dekabrın 27-də ADPU-da Kimya və biologiya fakültəsinin təşəbbüsü ilə Ulu Öndər Heydər Əliyevin 100 illiyinə həsr olunmuş "Azərbaycanda pedaqoji təhsilin inkişaf perspektivləri" mövzusunda elmi seminar təşkil olunub. Elm və Təhsil Nazirliyinin akademik Y.H.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun baş direktoru, Pedaqoji Universitetin məzunu, akademik Vaqif Abbasovun təqdimatında keçirilən seminarda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, beynəlxalq əlaqələr üzrə prorektor, professor Mahirə Hüseynova, Kimya və biologiya fakültəsinin dekanı, dosent Reyhan Ağayeva, Filologiya fakültəsinin dekanı, fil.ü.f.d., dosent əvəzi Könül Həsənova və Universitetin professor-müəllim heyəti iştirak edib. Rektor prof. C.Cəfərov və fakültə dekanı dos. R.Ağayevanın giriş sözündən sonra çıxış edən akad. Vaqif Abbasov Ulu Öndər Heydər Əliyevin dünyamiqyaslı siyasətindən, onun bütün fəaliyyəti dövründə elm, təhsil və mədəniyyətin inkişafına xüsusi qayğı ilə yanaşmasından, müəllim peşəsinin dəyərləri və ideal müəllim modelindən, cəmiyyətin həyatında mühüm rolu olan elm və təhsil sahəsindəki islahatlardan, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Azərbaycan təhsilinin inkişafı üçün apardığı uğurlu təhsil islahatlarından bəhs edib. Prof. Ə.Zalov, dos. H.İbrahimov, prof. N.Verdizadə və digərləri mövzu ətrafında çıxışlar edib, akademikə gənc kimya müəllimlərinin yetişməsinə göstərdiyi dəstəyə görə təşəkkür ediblər.

## ADPU ƏMƏKDAŞLARI VƏ FƏAL TƏLƏBƏLƏR TƏLTİF OLUNUBLAR



"Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev İli" elan edilməsi ilə bağlı Tədbirlər Planı"nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 2022-ci il 28 noyabr tarixli Sərəncamının icrası ilə əlaqədar Səbail rayonunda il ərzində keçirilmiş yaradıcılıq festivallarının, müxtəlif nominasiyalar üzrə müsabiqələrin qaliblərinin, eyni zamanda rayonun ictimai-siyasi həyatında fərqlənənlərin mükafatlandırılma tədbiri keçirilib. Tədbirdə Rayon İcra Hakimiyyətinin (RİH) başçısı Vüqar Zeynalov, RİH başçısının müavinləri, RİHBA-nın məsul əməkdaşları və fəal gənclər iştirak ediblər. Tədbirdə il ərzində rayonun ictimai-siyasi həyatında fərqlənmiş gənclər Rayon İcra Hakimiyyəti başçısının Fəxri Fərmanları təltif olunublar. Pedaqoji Universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri, mətbuat katibi Cavid Hüseynov, şöbənin redaktoru Taleh Mirzəyev, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin mütəxəssisi İsmayıl Nəsirov, eləcə də ADPU Tələbə Gənclər Təşkilatının sədri Təhmasib İmaməliyev, ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədr müavini Camilə Qurbanova və ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin sədri Nərgiz Quliyeva da il ərzində Səbail rayonunda ictimai-siyasi həyatda fərqləndiklərinə görə təltif olunanlar arasında yer alırlar.

## 2023-CÜ İL ADPU-NUN İCTİMAİYYƏTLƏ ƏLAQƏLƏRİNDƏ YÜKSƏLİŞ VƏ OPERATİVLİK İLİ KİMİ YADDA QALDI

SON 3 İLDƏ ADPU-NUN İNFORMASİYA YAYIMINDA 110 FAİZƏDƏK ARTIM QEYDƏ ALINIB



QR KODU OXUT, HESABATLA TANIŞ OL




1




3




2




4




## "TÜRK DÜNYASININ MƏDƏNİYYƏT PAYTAXTI ŞUŞA" RESPUBLİKA ELMİ KONFRANSI KEÇİRİLİB

Dekabrın 14-də Pedaqoji Universitet və onun Şamaxı filialının birgə təşkilatçılığı ilə filialda "Heydər Əliyev İli" çərçivəsində "Türk dünyasının mədəniyyət paytaxtı Şuşa" adlı Respublika elmi konfransı keçirilib.

Əvvəlcə Ulu Öndər Heydər Əliyevin rayondakı abidəsi və Şəhidlər Xiyabanı ziyarət olunub. Sonra filialda "Ulu Öndər Heydər Əliyev və müasir Azərbaycan" mövzusunda sərgiyə baxış keçirilib. Plenar iclasda filialın direktoru, dos. Tünzalə Yusifova, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, prof. Asəf Zamanov, Şamaxı Rayon İcra Hakimiyyəti başçısının müavini Mehriban Eyyubova və ADPU-nun Türk odası və Türk Araşdırmaları Elmi-Tədqiqat Mərkəzinin rəhbəri, prof. Elman Quliyev çıxış ediblər. Vurğulanıb ki, TÜRKSOY-a üzv ölkələrin mədəniyyət nazirlərinin Daimi Şurasının növbədənkənar iclasında Şuşa şəhəri 2023-cü il üçün "Türk dünyasının mədəniyyət paytaxtı" elan edilib. Plenar iclasdan sonra konfrans işini bölmələrində davam etdirib. Əyani və onlayn qaydada 200-ə yaxın məruzənin dinlənildiyi konfransda bir çox nüfuzlu təhsil müəssisələrindən alim və tədqiqatçılar iştirak ediblər.



Plenar iclasda filialın direktoru, dos. Tünzalə Yusifova, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, prof. Asəf Zamanov, Şamaxı Rayon İcra Hakimiyyəti başçısının müavini Mehriban Eyyubova və ADPU-nun Türk odası və Türk Araşdırmaları Elmi-Tədqiqat Mərkəzinin rəhbəri, prof. Elman Quliyev çıxış ediblər. Vurğulanıb ki, TÜRKSOY-a üzv ölkələrin mədəniyyət nazirlərinin Daimi Şurasının növbədənkənar iclasında Şuşa şəhəri 2023-cü il üçün "Türk dünyasının mədəniyyət paytaxtı" elan edilib. Plenar iclasdan sonra konfrans işini bölmələrində davam etdirib. Əyani və onlayn qaydada 200-ə yaxın məruzənin dinlənildiyi konfransda bir çox nüfuzlu təhsil müəssisələrindən alim və tədqiqatçılar iştirak ediblər.



Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 89

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.